Yaşar Qurbanov
"İslam Nuru" kitabından
www.islamevi.az
yasareseri@islamevi.az

# Tövhidin Tərifi və Mahiyəti

Allah təala insanları özünə ibadət etmək üçün yaratmışdır. Tovhid Allahın ibadətdə fərdiləşdirilməsi, yəni ibadətin yalnız Vahid Allaha məxsus edilməsi deməkdir. Allah buyurur: **«Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım»** *(əz-Zariyat, 56)*, yəni Məni ibadətdə tovhid və duada fərdiləşdirmək üçün yaratmışam.

Şeyxülislam Məhəmməd ət-Təmimi demişdir: "Peyğəmbərlərin irəli sürdükləri tovhid prinsipi Vahid Allahın yeganə tanrı olmasının isbatı və Ondan başqa ibadət haqqına malik tanrının olmaması fikrini qəbul etmək, yalnız Allaha ibadət etmək, yalnız Ona təvəkkül etmək, yalnız Onun yolunda cihada çıxmaq və həmçinin, Onun Özünə aid etdiyi ad və sifətlərə şəhadət vermək deməkdir".

Tovhid prinsiipini yalnız sözdə qəbul etmək kifayət deyildir və ona etiqad abstrakt ola bilməz.

Keçmiş dövrdə mütəkəllimlər (ilahiyyətçi filosoflar) və sufilər tovhid prinsipini nəzəri dəlillərlə sübuta yetirməklə öz işlərini başa çatmış hesab etmişlər. Lakin həqiqi müvəhhid (tovhid sahibi) olmaq üçün yalnız sözdə Allahın təkliyini iqrar etmək kifayət deyildir. Bunun üçün birinci növbədə **"Lə iləhə illəllah"** şəhadətini verib onun tələblərini əməli işdə - vahid və şəriksiz Allaha ibadətə mültəzim olmaqda həyata keçirmək vacibdir.

Allah təkcə Yaradan (əl-Xaliq) və ruzi verən (ər-Rəzzaq) deyil. O, həm də və birinci növbədə yeganə bir məbuddur, yəni ibadətin bütün növləri yalnız və yalnız Ona məxsusdur, Ona ünvanlanmışdır.

Vaxtilə Cahiliyyə və erkən İslam dövründə müşriklər də Allahın bütün varlığın yaradanı olması fikrini irəli sürsələr də ibadətlərində cansız bütlərə üz tutduqlarını və onları Böyük və Qadir Allaha şərik qoşduqları üçün müşrik olaraq qalırdılar.

Allah təala onlar barədə demişdir: **«Onların əksəriyyəti ancaq şərik qoşaraq Allaha inanarlar»** *(Yusif, 106)*.

Sələflər demişlər: "Onlardan, "yeri və səmaları kim yaratmışdır?" deyə soruş. Onlar deyəcəklər ki, Allah. Amma bununla belə Ondan

qeyrisinə də ibadət edəcəklər. Allah təala buyurur: «*(Ya Məhəmməd! Bu müşriklərə)* **De: "Əgər bilirsinizsə** *(bir deyin görək)* **bu yer və yer üzündə olanlar kimindir?" Onlar mütləq: "Allahındır!"- deyə cavab verəcəklər. Sən də de: "Bəs elə isə düşünmürsünüz?" De ki: "Yeddi** *(qat)* **göyün Rəbbi, o** *(böyük)* **əzəmətli Ərşin Rəbbi kimdir?"** *(Müşriklər)* **mütləq: "***(Bunlar)* **Allahındır!" – deyə cavab verəcəklər. Onda sən də de: "Bəs elə isə** *(Allahın əzabından)* **qorxmursunuz?" De: "Əgər bilirsinizsə** *(bir deyin görək)* **hər şeyin hökmü əlində olan,** *(istədiyini)* **himayə edən, amma Özünün himayəyə ehtiyacı olmayan kimdir?" Onlar mütləq: "***(Bu qüdrət, bu vəsflər yalnız)* **Allahındır!" – deyə cavab verəcəklər. Sən də de: "Bəs onda nə üçün** *(Şeytana aldanıb haqqa boyun qoymaqdanq, Allahın ayələrinə inanmaqdan və yalnız Ona ibadət etməkdən)* **nə cür** *(aldanılıb)* **döndərilirsiniz?»** *(əl-Muminun, 84-89)*.

Tovhidin Qurani Kərimdə aşağıdakı növləri göstərilir:

**1) Rəbbin tovhidi:** Allahın Rəbb, Sahib və Xaliq (Yaradan) olmasını qəbul etmək deməkdir. Qeyd etmək lazımdır ki, kafirlər də bunu etiraf etsələr də, İslama daxil ola bilməmişlər.

Allah təala onlar barədə buyurur: **«And olsun ki, əgər onlardan özlərini kimin yaratdığını soruşsan, mütləq: "Allah!" – deyə cavab verəcəklər! Elə isə** *(haqdan)* **necə dgndərilirlər?»** *(əz-Zuxruf, 87)*.

**2) Tanrının (İlahinin) tovhidi:** Allahın ibadətin bütün şəriətlə məqbul növlərindən olan tovhididir (təkliyidir). Bu növlərə dua, istiğasə (kömək diləmək), təvaf (Kəbənin başına dolanmaq), qurban kəsmək, nəzir vermək və i.a. daxildir.

Nuhdan (ə) tutmuş Məhəmmədə (s.a.v.) qədər olan dövrlərdə müvəhhidlərlə müşrik və kafirlər arasında bu prinsipin qəbulu məsələsində şiddətli mübarizə getmişdir.

Onlar ibadətlərin yalnız Allaha aidliyini inkar etmiş **«Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!»** ifadəsini qəbul etməmişlər. Allah təala buyurur: **«Mən, həqiqətən Allaham. Məndən başqa heç bir tanrı yoxdur. Mənə ibadət et və Məni anmaq üçün namaz qıl!»** *(Ta ha, 14)*.

**3) Ad və sifətlərin (atributların) tovhidi:** Bu Qurani Kərimdə və Səhih Sünnədə verilən, Allahın Özünə və yaxud Rəsulunun Ona şamil etmiş olduğu bütün sifətlərə iman gətirmək, onları qeydsiz və şərtsiz qəbul etmək deməkdir.

Bu sifətlərə: İsteva (yüksəlmək, ucalmaq), Nuzul (enmək), əl, görmək, eşitmək, canlı olmaq və i.a. daxildir. Həm də mömin bəndə bu

sifətləri təhrif etmədən, onları naqisləşdirmədən (tətil), keyfiyyəti barədə fikir yürütmədən (təkyif), insani sifətlərə bənzətmədən (təmsil) və sifətlərin necəliyini soruşmadan (təfhid) qəbul etməlidir.

İmam Malik demişdir: “İsteva məlumdur, onun necəliyi məchuldur, ona iman vacibdir və onun barədə sual vermək isə bidətdir”.

Allah təala insanları Ona ibadət etmək üçün yaratmış və onları Allahın tovhidinə dəvət etmək üçün yer üzünə peyğəmbərlər göndərmişdir.

Tovhid əqidəsinin ən böyük mənbəyi Qurani Kərimdir. Onun çoxsaylı surələrində və ayələrində tovhid prinsipinin əsasları, şirkin həm fərdlərə, həm də bütövlükdə millətə zərərli təsiri açıqlanır və sübut edilir ki, dünyanın məhv olması və canlı məxluğun əbədi olaraq odda yanmağa məhkum edilməsinin səbəbi tovhidin inkar edilməsidir.

Buna görə də tovhidi yuxarıda göstərdiyimiz mənada başa düşənlər -onlardan çoxu müsəlmandırlar- ulduzlara və şeytanlara ibadətdə özünü göstərən sehirkarlığa, habelə müxtəlif növ cadulara, şaman ayinlərinə, qara və ya qırmızı heyvanı qurban kəsməklə bağlı xurafata qurşandılar.

Onların yolu ilə gedənlər də heç şübhəsiz ki, günəşə, aya və ulduzlara ibadət və dua edənlər, onlara uz tütüb oruc tutanlar, dini ayinləri icra edənlər, onlara yaxınlıq edənlər, yəni qurban kəsib süfrələr açan, hətta Allah evinə həcc ziyarətini belə bu cür ayinlərə çevirənlər olmalıdırlar.

Onlar isə deyirlər ki: “Bu heç də şirk deyildir. Şirk o zaman olur ki, mən onları (ulduzların, ayın, günəşin və i.a.) qabaqcadan Mənim üçün hazırlanmış olduğuna əmin olum, onu səbəb və vasitə edim. Mən isə müşrik deyiləm”.

İslam dininin zəruri tələbləri baxımından bu açıq-aydın şirkdir. Bu da son və qəti fikirdir. Allah təala buyurur: **«Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım»** *(əz-Zariyat, 56)*.

Şeyxülislam Məhəmməd ət-Təmimi demişdir: “İbadət Allahın sevdiyi, razı qaldığı həm gizli, həm də açıq sözlərin ümumi adıdır”.

İbn əl-Qəyyim demişdir: “İbadət on beş əsas prinsipi əhatə edir. Onları mükəmməl şəkildə mənimsəyən şəxs ibadətin bütün dərəcələrində kamilliyə çatmış olur”.

Bu fikri belə başa düşmək lazımdır: İbadət qəlb və bədən üzvləri arasında bölünür. İbadətin hökmləri belədir: vacib, müstəhəb (bəyənilən), haram, mübah (icazə verilən) və məkruh (rədd edilən, nifrət edilən). Onlar həm qəlbi, həm dili, həm də bədən üzvlərini əhatə edirlər.

Bütün peyğəmbərlər öz dəvətini tovhidə - Vahid Allaha imana

çağırmaqla başlamışlar. Allah təala buyurur: «*(Ya Məhəmməd!)* **Səndən qabaq elə bir peyğəmbər göndərmədik ki, ona: "Məndən başqa heç bir tanrı yoxdur və yalnız Mənə ibadət edin!"- deyə vəhy etməyək»** *(əl-Ənbiya, 20)*.

Allah təala buyurur: **«Biz hər ümmətə: "Allaha ibadət edin, Tağutdan çəkinin! – deyə peyğəmbər göndərmişdik…»** *(ən-Nəhl, 36)*. Tağut tüğyan sözündəndir, mənası həddi aşmaq deməkdir.

Ömər bin Xəttab (r.a.) demişdir: "Tağut Şeytandır".

Peyğəmbər (s.a.v.) öz ardıcıllarına İslama dəvəti insanları tovhidə çağırmaqla başlamağı öyrətmişdir. Bu məqsədlə Muazı Yəmənə göndərəndə ona tapşırmışdır: *"Onları dəvət etdiyin ilk şey **"Lə iləhə illəllah və Muhəmmədən rəsulullah"** ifadəsi olmalıdır ki, onlar Allahın tovhidini qəbul etsinlər"* (Hamılıqla məqbul hədisdir).

Müslim öz "Səhih" əsərində Ənəs bin Malikdən (r.a.) bu hədisi verir: Peyğəmbər (s.a.v.) demişdir: *"Allah təala buyurur ki, cəhənnəm əhlinin əzabını yüngülləşdirərəm: Dünya, onda olanlar, onun kimi olanlar və onunla bağlı olanlar sənin olsalar sən onlarla xilas ola bilərsənmi?" Deyir ki, bəli. Allah təala buyurur: Mən istədim ki, sənin əzabını yüngülləşdirəm. Sən Adəm belindən gəlmisən. Şərik qoşmasan, Mən bunu nəzərə alıb səni oda daxil etmərəm. Şirkdən başqa hər şeyi bağışlayıram"* (İmam Əhməd və əl-Buxarinin rəvayətidir).

Müşrik Allah təalanın ondan tələb etdiyinə: Onun tovhidinə, Ona şərik qoşmamağa qarşı çıxır. Allahın istəyinin əksinə olaraq Ona başqasını şərik qoşur.

Tovhid **"Allahdan başqa ibadət haqqı olan tanrı yoxdur və Məhəmməd Onun peyğəmbəridir"** şəhadətində ifadə olunmuşdur. Bunun mənası odur ki, yalnız Allahın ibadət haqqı, məbud (ibadət edilən) olmaq haqqı vardır. İbadət isə yalnız Allahın peyğəmbərinin göstərdiyi yolla olmalıdır. Bu şəhadətlə kafirlər İslama daxil ola bilmirlər. Bu şəhadət cənnətin açarıdır. Onu qəbul edən, şirk və küfür mənasını verən sözləri işlətməyən şəxs cənnətə daxil olur.

Qureyşli kafirlər Peyğəmbərə (s.a.v.) saysız-hesabsız sərvət, mal-dövlət və s. dünyəvi ləzzətlər təklif etdilər ki, bunların müqabilində o, tovhid dəvətindən və onların bütlərini ifşa etməkdən əl çəksin. Lakin Rəsulullah (s.a.v.) 13 il hər növ təhqirə, əzab və əziyyətə səbrlə dözüb haqqın qələbəsinə -insanların tovhidi qəbul etməsinə nail oldu.

Tovhid hər bir müsəlmanın həyat vəzifəsidir, həyat tovhidlə başlanır. Hər bir iş, hər bir vəzifə tovhidi rəhbər tutmaqla həyata keçirilir. Çünki tovhid möminləri birləşdirir, onları tovhid kəlməsi ətra-

fında toplayır.

Allah təaladan tovhidi bu dünyada bizim son sözümüz etməyi bütün müsəlmanları tovhid kəlməsi ilə birləşdirməyi arzu edirik.

Tovhidi qeydsiz-şərtsiz qəbul edən və əməldə də ona mültəzim olan hər bir mömin müsəlman özünü tam əmin-amanlıq içində hiss edə bilər. Allah təala buyurur: **«İman gətirib imanlarını zülmə qatışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır!»** *(əl-Ənam, 82)*.

Bu ayə öz imanında saf və pak olan, onun şirk və küfürdən təmiz saxlayan və əməldə də bu işlərdən uzaq olan möminlərə cəhənnəm əzabından xilas olmaları və onların bu dünyada hidayət yolunun yolçuları olduqları barədə mücdə verir.

Peyğəmbər (s.a.v.) demişdir: "İmanın 60 dan artıq şöbəsi vardır. On*lardan ən yüksək olanı* ***"Allahdan başqa tanrı yoxdur"*** *kəlamı, ən aşağıda olanı isə yoldan əzab əziyyəti kənar etməkdir"* (Müslim).

Tovhid prinsipinin qəbulu və onun əməldə tətbiqi mömin müsəlmanın həyatının daha mənalı edir, ona sədaqət, xoşbəxtlik gətirir.

Peyğəmbər (s.a.v.) demişdir: *"Allahdan başqa tanrı olmamasını, Onun şəriksizliyini, Məhəmmədin Onun qulu və rəsulu olmasını, İsanın Allahın qulu və rəsulu, Məryəmə yerləşdirdiyi kəlamı və ruhu olmasını, cənnətin və cəhənnəmin haqq olmasını qəbul edən şəxsi Allah onun əməllərini də nəzərə almaqla cənnətə daxil edəcəkdir"* (əl-Buxari).

Bu o deməkdir ki, bütün bu şəhadətləri deyən və əməldə də onlara mültəzim olan müsəlman üçün cənnət qapıları, nemət evinin qapıları onun üzünə açıqdır. Onun əməldə ola bilər ki, bəzi kiçik günahları - şirk həddinə çatmayan günahları tövbə ilə bağışlansın. Hədisi şərifdə deyildiyi kimi ola bilər ki, insanın günahları yer üzünü bürüsün, amma o, öləndə dilində tovhid kəlməsi ilə özünə bağışlanma qazana bilər.

Peyğəmbər (s.a.v.) demişdir: *"Allaha bir şeyi şərik qoşmadan ölən şəxs cənnətə daxil olur. Allaha bir şeyi şərik qoşmanın yeri isə cəhənnəmdir"* (Muslim).

Bütün bu hədislər göstərir ki, tovhid böyük fəzilətə malikdir. O, bəndənin xoşbəxtliyini təmin edən ən böyük amildir, günahların inkarı və xətalardan təmizlənməyin ən əsas yoludur. Tovhid insan həyatında və bütövlükdə cəmiyyətdə tam səmimiyyətlə və şəriət qanunlarıyla tətbiq edildikdə çoxsaylı səmərələr verir. Bunlardan aşağıdakıları göstərmək olar:

1) İnsanın qul olmaqdan azad edilməsi, Allahdan başqa hər hansı bir varlığa baş əyməsi. Tovhid insanı Allahın qulu olmaqdan başqa

bütün başqa asılılıqlardan azad edir.

2) Tovhidin köməyi ilə pak insan şəxsiyyəti formalaşır, onun həyatı öz sabitliyi və əmin-amanlığı ilə fərqlənir.

3) Tovhid insanın təhlükəsizliyini təmin edən amildir. O öz sahibinin qəlbini əmin-amanlıq və arxayınlılıq hissi ilə doldurur. İnsan Allahdan başqa heç kəsdən qorxmur, ruzi, can və ailə üçün çəkilən qorxunun qarşısını alır.

Peyğəmbərlərin ilk çağırışı Allahın da qeyd etdiyi tovhid kəlməsidir: **«Biz hər ümmətə: "Allaha ibadət edin, Tağutdan çəkinin! – deyə peyğəmbər göndərmişdik...»** *(ən-Nəhl, 36).* Tağut Allahdan başqa ibadət ediləndir.

Alimlər peyğəmbərlərin varisləri olduqları üçün onlar da peyğəmbərlərin başladıqları ilə başlamalı və insanları ibadətlərin bütün növlərində Allahın təkliyinə (tovhidə) inama çağırmalıdırlar. Allahın tovhidi özünü ibadətin bütün formalarında göstərməlidir.

Peyğəmbər (s.a.v.) demişdir: *"Dua ibadətdir"* (ət-Tirmizi).

Tovhidi müdafiə edib şirkə qarşı çıxmaq məsələsində alimlər müxtəlif mövqeylərdə olmuşlar. Bunlardan aşağıdakıları göstərmək olar:

1) Tovhid, onun əhəmiyyəti və növlərini başa düşmüşlər. Şirki və onun formalarını öyrənib onlara qarşı çıxmamış, insanlara tovhidlə şirkin fərqini izah etməmişlər.

2) Bəzi alimlərsə tovhidə dəvətə biganə qalıb namaz, oruc və cihad məsələləri ilə məşğul olmuş, insanların əqidəsinin formalaşmasında İslamın bu əsas prinsipinin rolunu düzgün qiymətləndirməmişlər. Halbuki, peyğəmbərlərin öz dəvətlərində zəfər çalmasının ilkin və əsas şərti onların tovhid ideyası ilə çıxış etməsi və ona mültəzim olması idi. Qələbənin əsas şərti tovhid, Allaha şərik qoşmanın inkarı olmuşdur.

3) Bir sıra alimlər insanları tovhidə çağırmaq və şirklə mübarizə məsələsini təqibə məruz qalmaq, vəzifədən qovulmaq, cəmiyyətdə yüksək mövqeyi itirmək qorxusundan bir kənara qoyub Allahın onlara əta etdiyi biliyi insanlara çatdırmırlar.

Allah təala buyurur: **«O peyğəmbərlər ki, Allahın hökmlərini** *(onlara verdiyi risaləti)* **təbliğ edər,** *(risalti tərk etməkdə)* **Ondan çəkinər və Allahdan başqa heç kəsdən qorxmazlar. Allah Özü haqq-hesab çəkməyə kifayətdir»** *(əl-Əhzab, 39).*

Peyğəmbər (s.a.v.) demişdir: *"Elmi gizlədəni Allah od buxovldarı ilə buxovlayır"* (Əhməd. Səhih hədisdir).

4) Alimlərin və şeyxlərin içində elələri vardır ki, onlar Allahın tovhidinə çağırışına qarşı çıxırlar. Onlar belə fikirdədirlər ki,

müsəlmanlar arasında şirkə yol verənləri yoxdur.

Əl-Əzhərin sabiq şeyxlərindən biri qəbrlərə üz tutub namaz qılmaq barədə suala belə cavab verir: “Qəbrə namaz qılmaq nə üçün olmasın?! Peyğəmbər (s.a.v.) də məsciddə dəfn olunmuşdur. İnsanlar onun qəbrinə üz tutub namaz qılır!”.

Halbuki Peyğəmbər (s.a.v.) məsciddə yox, Aişənin evində dəfn edilmişdir. O, həmişə qəbrlərə namaz qılmağı inkar etmiş və demişdir: *“Allahım, mən Səndən faydasız elmdən qorunmaq üçün kömək diləyirəm”* (Müslim).

Burada faydasız elm dedikdə başqalarına öyrədilməyən, ona əməl edilməyən və pis əxlaqı təmizləməyə xidmət etməyən elm nəzərdə tutulur.

Müsəlmanlar tovhid çağırışını qəbul etməli, bu dəvəti edənlərə bağlı olmalıdırlar. Tovhid bütün peyğəmbərlərin dəvətidir, xüsusilə bizim peyğəmbərimiz Məhəmmədin (s.a.v.) dəvətidir.

Peyğəmbəri (s.a.v.) sevən şəxs tovhid dəvətinə biganə qala bilməz. Tovhidə qarşı çıxan heç şübhəsiz Peyğəmbərin (s.a.v.) özünə qarşı çıxmış olur.

“Qurratul uyun” kitabında yazılmışdır: “Müsəlmanların sonrakı nəsillərinin əksəriyyəti ən böyük haram işlərdən olan bu şirkə yol verirlər. Eynilə Peyğəmbərdən (s.a.v.) qabaq cahiliyyə ərəbləri də bu cür şirkə yuvarlanmışdılar. Onlar qəbrlərə, məşhədlərə (valilərin və imamların qəbrlərinə), ağaclara, daşlara, tağutlara və cinlərə ibadət etmişlər. Cahiliyyə ərəbləri də eynilə Lat, Üzzə, Mənat, Həbl və başqa bütlərə ibadət edirdilər. Bu şirki özlərinə din seçdilər. Tovhidə dəvəti kəskin bir nifrətlə rədd etdilər. Onların ürəkləri müvəhhidlərə qarşı kin və küdurətlə dolu idi.

Allah təala onlar barədə demişdir: **«Allah tək olaraq anıldığı** (lə iləhə illəllah deyildiyi) **zaman axirətə inanmayanların qəlbləri nifrətlə dolar. Ondan** (Allahdan) **başqaları** (bütlər, tanrılar) **yad edildiyi zaman onları dərhal sevinc bürüyər»** *(əz-Zumər, 45)*.

Allah həmçinin buyurur: **«…Sən Quranda Rəbbini bir tək tanrı olaraq andığın zaman onlar nifrət əlaməti olaraq arxalarını çevrilib gedərlər»** *(əl-İsra, 46)* və yaxud onlara: **«Onlara: “Allahdan başqa heç bir tanrı yoxdur!” - deyildiyi zaman təkəbbür göstərirdilər. Və: “Biz heç divanə bir şairdən ötrü tanrılarımızı tərk edirikmi?!” - deyirdilər»** *(əs-Saffat, 35-36)*.

Onlar bildilər ki, **“Lə iləhə illəllah”** ifadəsi yol verdikləri şirki rədd edir. Onlar bu ifadənin məzmunundan irəli gələn tovhid prinsipini

inkar etmişlər. Bu müşriklər **"Lə iləhə illəllah"** kəlamının mənasının müsəlmanların sonrakı nəslinin nümayəndələrindən, o cümlədən kəlam elminin bir çox sahələrindən tanınmış alimlərdən daha yaxşı başa düşmüşlər.

Bu sonuncular ibadət tovhidini nəzərə almayaraq ona qarşı duran şirkə yol vermişlər və bu şirki daha da bəzəmişdilər. Bu alimlər adlar və sifətlərin tovhidinə də biganə qalıb onu inkar etmişlər. Nəticədə tovhidin özünü də inkar etmişlər.

Allah təala insanları Ona ibadət etmək üçün yaratmış, onları öyrətmək üçün peyğəmbərlər göndərmişdir. Allah peyğəmbərlərə kitablar da bəxş etmişdir ki, onlar bu kitabları rəhbər tutaraq və birinci növbədə tovhid prinsipindən çıxış edərək insanlar arasında haqq və ədalətlə hökm etsinlər. Allahın hökmü ibadət, müamilə, əqidə, siyasət və başqa bəşəri işləri əhatə edir:

1) <u>Əqidə məsələsində hökm</u>. Peyğəmbərlər hər şeydən əvvəl insanların əqidəsini, fikir və düşüncələrini təshih etməkdən başladılar. Bu da insanları tovhidə iman gətirməklə başlandı.

Yusif (ə) zindanda olarkən yoldaşları ilə söhbətində deyir: **«***(Allahdan)* **qeyri ibadət etdikləriniz sizin və atalarınızın** *(özünüzdən uydurub)* **qoyduğunuz** *(Allaha heç bir aidiyyəti olmayan)* **adlardan** *(bütlərdən)* **başqa bir şey deyildir. Allah isə onlara** *(ibadət edilməsinə dair)* **heç bir dəlil nazil etməmişdir. Hökm ancaq Allahındır. O sizə yalnız Onun Özünə ibadət etmənizi buyurmuşdur. Doğru,** *(həqiqi)* **din budur, lakin insanların əksəriyyəti** *(bu həqiqəti)* **bilməz!»** (Yusif, 40).

2) <u>İbadətlərdə hökm</u>: Namaz, Zəkat, Həcc və başqa ibadət növlərində hökmləri yalnız Qurani Kərimdən və səhih hədislərdən götürməliyik. Peyğəmbərimiz (s.a.v.) buyurduğu *"Mən necə namaz qılıramsa, siz də elə namaz qılın"* hökmünə sözsüz əməl etməliyik.

3) <u>Alqı-satqı, kredit, icarə və başqa müamilələrdə </u>Allahın və Onun Rəsulunun (s.a.v.) hökmlərindən başqa hökmlərə yer olmamalıdır. Allah təala buyurur: **«Amma xeyr!** *(Ya Məhəmməd!)* **Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə** *(həqiqi surətdə)* **iman gətirmiş olmazlar»** (ən-Nisa, 65).

4) <u>Qanunvericilik məsələlərində</u> də vahid Allahın tovhid prinsipindən çıxış etmək vacibdir. Allah təala buyurur: **«Allah: "Dini doğru tutun** *(qoruyub saxlayın)*, **onda ayrılığa düşməyin!" - deyə**

**Nuha tövsiyə etdiyini, sənə vəhy buyurduğunu, İbrahimə, Musaya və İsaya tövsiyə etdiyini dində sizin üçün qanuni etdi»** (əş-Şura, 13).

İbn əl-Qeyyim əl-Cauziyyə deyir: "Siratul müstəqim (düz yol) barədə qısa bunu demək olar: bu Allahın öz bəndələrinə Onun dərgahına çatmaq üçün göstərdiyi yoldur. Ona bundan başqa yol yoxdur. Bu onun göstərdiyi haqq yoludur. Onun öz rəsullarının dili ilə göstərdiyi yoldan başqa bütün qalan yollar məxluq üçün bağlıdır. Yalnız bu yolu Allah Özünə ibadət üçün açmışdır. Bu yalnız Ona ibadətlə, Onun rəsullarına itaətlə, Onu fərdiləşdirmək, ibadətdə Ona, itaətdə Onun Rəsuluna (s.a.v.) heç kəsi şərik qoşmamaq yoludur. Bununla tovhidin, Onun Rəsuluna (s.a.v.) itaətin mənası aydınlaşır. Bütün bu deyilənlər **"Lə iləhə illəllah, Muhəmmədən Rəsulullah"** şəhadətinin məzmunundan irəli gəlir.

"Siratil mustəqi"min hər hansı bir təfsiri bu iki prinsipə əsaslanır. Bunun incəliyini göstərək: Sən Allahı öz qəlbinlə sevirsən, Onun razılığını qazanmaq üçün var qüvvəni toplayırsan. Sənin qəlbinin hər bir guşəsi yalnız Ona məhəbbətlə doludur. Sənin iradən yalnız Onun istəyindən asılıdır. Birinci prinsip **"Lə iləhə illəllah"** şəhadəti ilə həyata keçir... İkinci isə **"Muhəmmədən Rəsulullah"** şəhadəti ilə həyata keçir.

Bu hüda və haqq dinidir. Bu, həqiqəti bilmək və ona əməl etməkdir. Bu onun Rəsululunun (s.a.v.) hansı göstərişlərlə göndərildiyini bilmək və onları yerinə yetirməkdir".